# القواعد الأربع

للشيخ الإسلام محمد بن عبد الوهاب

رحمه الله تعالى

١١١٥ - ١٢٠٦هـ

شرح

معالي الشيخ الدكتور

صالح بن فوزان عبد الله الفوزان

# Dörd qayda

## Şeyxül-islam Muhəmməd ibn Abdul Vahhab

رحمه الله تعالى

Şərh

**Şeyx Saleh ibn Fauzan Abdullah Fauzan**

حفظ الله تعالى

Cəm edib tərcümə edən
Allahın fəqir qulu
Rəşad Əbu Muhamməd Əl-Misriy

بسم الله الرحمن الرحيم

إن الحمد لله نحمده و نستعينه، و نستغفره، و نعوذ بالله من شرور أنفسنا و من سيئات أعمالنا، من يهده الله فلا مضل له، و من يضلل فلا هادي له، و أشهد أن لا إله إلا الله وحده لا شريك له, و أشهد أن محمداً عبده و رسوله

أما بعد:

فإنَّ أصدقَ الحديثِ كتاب الله، و أحسن الهَدي هَدْيُ محمدٍ صلى الله عليه و سلم، و شَرَّ الأمور محدثاتُها، و كلّ محدثةٍ بدعة، و كلّ بدعةٍ ضلالة، و كلّ ضلالةٍ في النار.

أما بعد:

# MÜQƏDDIMƏ

أسأل الله الكريم ربَّ العرش العظيم أن يتولاّك في الدنيا و الآخرة، و أن يجعلك مباركاً أينما كنت، و أن يجعلك ممَّن إذا أُعطي شكر، و إذا ابتُلي صبر، و إذا أذنب استغفر، فإن هؤلاء الثلاث عنوان السعادة.

**Səxavətli Allahdan, Böyük Tac Sahibindən diləyirəm ki, səni bu dünyada və Axirətdə Özünə yaxınlaşdırsın, harda olursan-ol, xeyir söz sahibi etsin və səni nəisə veriləndə şükr edənlərdən, imtahana çəkiləndə səbr edənlərdən, günah işlədəndə isə tövbə edənlərdən etsin, belə ki, bu üç hal elə xoşbəxtliyin özüdür.**

---

Şeyxül-islam Muhəmməd ibn Abdul Vəhhab (رحمه الله تعالى) **"Dörd qayda"** adlı nəsihətamiz risaləsini belə başlayır. O **"Üç əsas"** risaləsəinə əlavə olunub ki, elm tələb edənlərin əlinin altında olsun. Və bunlar – çoxlu məsələlərə və fəsillərə ayrılan qaydalardır - əsaslardır. Bu dörd qayda özündə tövhid haqqında şirk haqqında elmi birləşdirir:

Nə üçün biz tövhid və şirk haqqında bu qədər çox danışırıq? Çünki çox insanlar bu iki anlayışı yanlış dərk edirlər, tövhid və şirk sözlərinin mənasında azırlar. Hamı bu sözləri öz nəfslərindən şərh edir. Lakin bizim Qurana və Sünnəyə dönməyimiz vacibdir. Şeyx bir çox yolunu azmışların etdiyi kimi, bu qaydalar haqqında öz fikirlərini, mülahizələrini demir, Quran və peyğəmbərin (صلى الله عليه و سلم) Sünnəsinə, onun sirasına, yəni tərcüməyi halına əsaslanır. Əgər sən bu qaydaları bilsən və onları başa düşsən, o zaman sənə tövhid elmi asanlaşar, həmçinin şirki də başa düşəcəksən, hansından ki, Allah çəkindirir və onun bu dünya və Axirət üçün ciddi və təhlükəli olduğunu bəyən edib. Bu məsələ çox vacibdir, hətta namazın və zəkatın

əhkamlarından, digər ibadət növlərindən və gündəlik əməllərindən də vacibdir, belə ki, bu məsələ birinci dərəcəli vacib məsələdir və bütün bu sadaladığımların əsasında dayanır. Çünki əgər namaz, zəkat, həcc düzgün əqidə üzərində – Allaha ibadətdə tövhid əqidəsi üzərində qurulmazsa, həqiqi ibadət sayılmır.

Bu qaydalara yazılmış muqaddimədə şeyxul-islam (رحمه الله تعالى) elm tələb edənlər üçün Allaha dua edir (yuxarıda). Bu, hər bir əqidə öyrənən və haqqı bilməyə səy göstərən, şirkdən və zəlalətdən uzaqlaşan elm tələbəsi üçün böyük duadır. Əgər Allah kimisə Özünə bu və digər dünyada yaxınlaşdırırsa, həqiqətən də, bu insanın səadəti deməkdir. Necə ki, Uca Allah buyurur:

اللَّهُ وَلِيُّ الَّذِينَ آمَنُوا يُخْرِجُهُم مِّنَ الظُّلُمَاتِ إِلَى النُّورِ ۖ وَالَّذِينَ كَفَرُوا أَوْلِيَاؤُهُمُ الطَّاغُوتُ

يُخْرِجُونَهُم مِّنَ النُّورِ إِلَى الظُّلُمَاتِ ۗ أُولَٰئِكَ أَصْحَابُ النَّارِ ۖ هُمْ فِيهَا خَالِدُونَ

**Allah Ona iman gətirənlərin dostudur, onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirlərin dostu isə Tağutdur. Onları nurdan ayırıb zülmətə salarlar. Onlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar!**

*(Bəqərə, 257)*

Və əgər Allah səni Öz yardımı və yönəltməsi ilə haqq yola yaxınlaşdırdısa, sən xoşbəxtsən və heç vaxt bədbəxt olmayanlardansan. Bu dünyada uğurlara, müvəffəqiyyətlərə, düzgün istiqamətə yaxınlaşdırırsa, o biri dünyada heç nədən qorxmadan əbədi Cənnətə qovuşdurur. Bu, Allahın Öz mömin quluna hər iki dünyada qayğısıdır.

Şeyx dua edir: **"harda olursan-ol, səni xeyir sahibi etsin"**, yəni bu, elm tələb edən üçün duadır, Allah bu dünyada, ruzisində, işində səni xeyir söz sahibi etsin, həmçinin sənin dostlarını və övladlarını da xeyir sahibi etsin. Bu, Allahdan böyük xeyirdir.

Həmçinin Onun bu sözləri: **"səni nəsə veriləndə, şükr edənlərdən etsin".** Çox insanlar Allah onlara rifah həyat bəxş edəndə, bütün bunların haradan gəlməsinə inanmırlar və mallarını Allaha xoş olmayan yerlərə xərcləyirlər. Bu da onların bədbəxtliyinə səbəb

olur. Çox varlılar var ki, bədbəxtdirlər. Kimsə şükr edirsə, Allah onun üçün daha da artırır. Necə ki, "İbrahim" surəsinin 7-ci ayəsində Allah deyir:

وَإِذْ تَأَذَّنَ رَبُّكُمْ لَئِن شَكَرْتُمْ لَأَزِيدَنَّكُمْ ۖ وَلَئِن كَفَرْتُمْ إِنَّ عَذَابِي لَشَدِيدٌ

**O zaman Rəbiniz bunu bildirmişdi: "Əgər Mənə şükür etsəniz, sizə olan nemətimi artıracağam. Yox, əgər nemətimə küfr etsəniz, Mənim əzabım, həqiqətən şiddətlidir**

*(İbrahim, 7)*

Allah Subhanə və Təala şükr edənləri Öz lütfü sayəsində ucaldır. Əgər Allahın sənə mərhəmətinin çoxalmasını istəyirsənsə, o zaman şükr et, yox əgər firavan həyatın sona çatmasını istəyirsən, o zaman nemətlərə küfr et.

Həmçinin Onun bu sözləri: **"imtahan edilәndə səbir edənlərdən"**. Allah Subhanə və Təala qullarını imtahana çəkir, pis hadisələrlə, kafir və munafiq düşmənlərlə imtahan edir, onlar səbr etməlidirlər, ruhdan düşməməlidirlər və Allahın mərhəmətindən ümüdlərini üzməməlidirlər. Öz dinlərdində daha da möhkəmlənməli və fitnələrə boyun əyməməlidirlər. Allah imtahan etdikdə, səbrsiz və naşükürlük edənlərdən, Allahın mərhəmətindən ümüdini üzənlərdən fərqli olaraq bu yolda müxtəlif maneələrə qarşı sərt olmalıdırlar. İmam Tirmizinin rəvayət etdiyi hədisdə peyğəmbər (صلى الله عليه و سلم) belə deyir

عِظَمُ الْجَزَاءِ مَعَ عِظَمِ الْبَلَاءِ وَإِنَّ اللَّهَ إِذَا أَحَبَّ قَوْمًا ابْتَلَاهُمْ فَمَنْ رَضِيَ فَلَهُ الرِّضَا وَمَنْ سَخِطَ فَلَهُ السُّخْطُ رواه الترمذي وابن ماجة وصححه الألباني

**Ən böyük mükafat ən böyük bəla ilə birgədir, Allah əgər hansı bir qövmü sevirsə, onları imtahan edir, kim razı qalsa, ona məmnunluq qalır, kim narazı qalsa, ona – narazılıq qalacaq.**

*(at-Tirmizi rivayət edir, Əl-Bəni səhih hesab edir)*

Allahın ən böyük imtahanları Onun rəsullarına düşüb, sonra əməlisalehlərə və şəhidlərə, möminlərə və onlar hamısı səbr ediblər. Munafiqlər haqqında isə Allah belə deyir:

مِنَ النَّاسِ مَن يَعْبُدُ اللَّهَ عَلَىٰ حَرْفٍ ۖ فَإِنْ أَصَابَهُ خَيْرٌ اطْمَأَنَّ بِهِ ۖ وَإِنْ
أَصَابَتْهُ فِتْنَةٌ انقَلَبَ عَلَىٰ وَجْهِهِ خَسِرَ الدُّنْيَا وَالْآخِرَةَ ۚ ذَٰلِكَ هُوَ الْخُسْرَانُ الْمُبِينُ

**İnsanlardan eləsi də vardır ki, Allaha şəklə ibadət edər. Əgər ona bir xeyir toxunsa, arxayın olar. Yox, əgər ona bir bəla müsibət üz versə, çöhrəsi dəyişər. Beləsi dünyanı da əldən verər, Axirəti də. Açıq-aşkar ziyan budur, bu!**

*(Həcc, 11)*

Həmçinin şeyx belə deyir **“günah işləyəndə tövbə edənlərdən”.** Kim daima günah edir və Uca Allahdan bağışlanma diləmirsə, Allah onun günahlarını artırır və bu əsil bədbəxtçilikdir. Yalnız mömin qulun günahları tövbə ilə təmizlənir. Uca Allah buyurur:

وَالَّذِينَ إِذَا فَعَلُوا فَاحِشَةً أَوْ ظَلَمُوا أَنفُسَهُمْ ذَكَرُوا اللَّهَ فَاسْتَغْفَرُوا لِذُنُوبِهِمْ وَمَن يَغْفِرُ
الذُّنُوبَ إِلَّا اللَّهُ وَلَمْ يُصِرُّوا عَلَىٰ مَا فَعَلُوا وَهُمْ يَعْلَمُونَ

**O kəslər ki, bir günah iş gördükləri, yaxud özlərinə zülm etdikləri zaman Allahı yada salıb günahlarının bağışlanmasını istəyərlər. Axı günahları Allahdan başqa kim bağışlaya bilər?**

*(Ali-Imran, 135)*

إِنَّمَا التَّوْبَةُ عَلَى اللَّهِ لِلَّذِينَ يَعْمَلُونَ السُّوءَ بِجَهَالَةٍ ثُمَّ يَتُوبُونَ مِن قَرِيبٍ فَأُولَٰئِكَ
يَتُوبُ اللَّهُ عَلَيْهِمْ ۗ وَكَانَ اللَّهُ عَلِيمًا حَكِيمًا

**Allah yanında yalnız o kəslərin tövbəsi qəbul olunar ki, onlar nadanlıq ucundan pis bir iş gördükdən sonra dərhal tövbə edərlər.**

*(Nisa, 17)*

Belə ki, nadanlıq – mülayimlik və kamalla təzad təşkil edir, həmçinin cahillik, yəni mülayimlik və ağılın kasadlığı. Və kim Allaha itaət etmirsə - nadandır və cahildir , yəni ağılda və insaniyyətdə çatışmamazlıq var, dünyavi elmlərdə alim insan də cahil və nadan ola bilər.

İnsan həyatının elə bu üç halı barədə şeyxül-islam (رحمه الله تعالى) Uca Allahda dua edir: əgər verdisə, şükür et, əgər imtahana çəkirsə, səbr et, əgər günah etdinsə, bağışlanma dilə. Onlar bu dünyada elə xoşbəxlik deməkdir, kim onlara müvəffəq olsa, xoşbəxtliyə çatacaq, kim məhrum olsa, o – bədbəxtdir.

**Bil, qoy Allah səni Ona tabe olanlardan etsin.**

**Həqiqətən də, İbrahimin dini - Tək Allaha səmimi qəlbdən ibadət etməkdir, din Ona məxsusdur. Necə ki, Uca Allah buyurur:**

وَمَا خَلَقْتُ الْجِنَّ وَالْإِنسَ إِلَّا لِيَعْبُدُونِ

**Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!** *(Zəriyət, 56)*

---

Şeyxül-islam (رحمه الله تعالى) elm öyrənənə belə dua ilə başlayır.

Tabe olmaq – Onun əmrlərinə itaət etmək və qadağalarından çekinməkdir. Allah aşağıdakı ayədə buyurduğu kimi, peyğəmbərimizə (صلى الله عليه و سلم) İbrahimin (عليه السلام) yolunu getməyi əmr edir.

ثُمَّ أَوْحَيْنَا إِلَيْكَ أَنِ اتَّبِعْ مِلَّةَ إِبْرَاهِيمَ حَنِيفًا ۖ وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ

**Sonra (Ya Rəsulum!) sənə: "Batildən haqqa dönərək müşriklərdən olmayan İbrahimin dininə tabe ol!" – deyə vəhy etdik.**

*(Nəhl, 123)*

Hənif – təkallahlı – bu İbrahimdir (عليه السلام) – Allahdan olan hər şeyi qəbul edib, Allahdan olmayanı inkar edir, bu hənifdir. Qəlbində, əməllərində, niyyətində və istəklərində qəbul edir ki, hər şey Allah üçündür, Allah üçün olmayanları inkar edir. Allah bizə İbrahimin (عليه السلام) yolunu getməyi əmr edir.

هُوَ اجْتَبَاكُمْ وَمَا جَعَلَ عَلَيْكُمْ فِي الدِّينِ مِنْ حَرَجٍ ۚ مِلَّةَ أَبِيكُمْ إِبْرَاهِيمَ ۚ هُوَ سَمَّاكُمُ الْمُسْلِمِينَ

**O (Öz dini üçün) sizi seçdi və dində sizin üçün heç bir çətinlik yeri qoymadı – atanız İbrahimin dini kimi. O sizi müsəlmanlar adını verdi**

*(Həcc, 78)*

İbrahimin (عليه السلام) dini – Tək Allaha ixlasla ibadət etmək deməkdir, çünki din Ona məxsusdur. Bu – elə həniflikdir. Yalnız **"Allaha ibadət etmək"** demir, həmçinin ixlaslı olmaq – din Ona məxsusdur, yəni şirkdən uzaqlaşmaq mütləq lazımdır, çünki ibadətə şirk qatsan, o (ibadət) əsassız və batil olacaq. Əgər böyük və kiçik şirkdən təmizləməsən, o zaman ümumiyyətlə ibadət sayılmayacaq.

وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَاءَ وَيُقِيمُوا الصَّلَاةَ وَيُؤْتُوا الزَّكَاةَ ۚ وَذَٰلِكَ دِينُ الْقَيِّمَةِ

**Halbuki onlara əmr edilmişdir ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa dönərək – ibadət etsinlər.**

*(Beyyinə, 5)*

Bu ibadəti Allah bütün yaradılmışlara əmr edir.

وَمَا خَلَقْتُ الْجِنَّ وَالْإِنسَ إِلَّا لِيَعْبُدُونِ

**Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!**
*(Zəriyət, 56)*

İbadət etmək – ibadətdə Tək Allahı seçmək, yaradılmışların yaradılmasındakı hikmət elə yalnız Allah Subhanə və Təalaya ibadət etməkdədir, ixlasla, çünki din Ona məxsusdur. Kimsə itaət edir, kimsə itaət etmir, lakin o insanların yaradılmasındakı hikmət budur, kim Allaha ibadət etmirsə, yaradılmışların yaradılmasındakı hikməti və şəriətin qoyduğu hökmləri inkar edir.

İbrahim (عليه السلام) Allaha ibadət etməyə dəvət edib, Ondan başqa batil tanrıları tərk etməyi dəvət edən bütün digər peyğəmbərlər kimi, İbrahim (عليه السلام) insanları Allaha ibadət etməyə dəvət edirdi.

وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ أُمَّةٍ رَّسُولًا أَنِ اعْبُدُوا اللَّهَ وَاجْتَنِبُوا الطَّاغُوتَ

**Biz hər ümmətə: "Allaha ibadət edin, Tağutdan çəkinin! – deyə peyğəmbər göndərmişdik**
*(Nəhl, 36)*

Şəriətlər (qanunlar) və qadağalar (halal, haram) ümmətdən ümmətə dəyişirdi. Axirətədək digər şəriətləri ləğv edən islam şəriəti gələnə qədər Allah şəriətdə nəyisə qüvvəyə mindirirdi, sonra onu başqa şəriətlə əvəz edirdi. Beləliklə də, peyğəmbərlərin dininin əsası tövhiddir. O ləğv edilməyib və edilməyəcək də. Onların dini birdir – islamdır, yəni tövhiddə Allaha ixlasla ibadət etməkdir.

**Əgər başa düşdünsə ki, Allah səni Ona ibadət etmək üçün yaradıb, bil ki, tövhidsiz ibadət ibadət sayılmır. Necə ki, təharətsiz namaz qılmaq namazı batil edir. Əgər ibadətə şirk qarışsa, onu batil edir, necə ki, təharətə natəmizlik qarışanda onu pozur.**

---

Yəni Uca Allahın ayələrindən başa düşdün ki, sən ibadət üçün yaradılan insanlar sırasındasan, Allah səni əyləncə üçün yaratmayıb. Bu dünyada əylənərək yeyib-içməyin üçün yaratmayıb. Bunlar üçün yaratmayıb. Allah səni Ona ibadət etməyin üçün yaradıb və ibadəti asanlaşdırmaq üçün səndə olan hər şeyi sənə tabe edib. Çünki sən bütün bunlarsız yaşaya bilməzsən. Və bütün bunlarsız ibadətə nail ola bilməzsən. Allah bütün bunları sənə tabe edib ki, Ona ibadət edəsən. Şənlənməyin, əylənməyin, əxlaqsızlıq etməyin, günah işlətməyin, içib-çəkməyin üçün yox. Bunlar – heyvanlara məxsus olan işlərdir. Yalnız insanı Allah böyük və müdrik bir məqsəd üçün yaradıb, bu – ibadətdir.

وَمَا خَلَقْتُ الْجِنَّ وَالْإِنسَ إِلَّا لِيَعْبُدُونِ ﴿٥٦﴾ مَا أُرِيدُ مِنْهُم مِّن رِّزْقٍ وَمَا أُرِيدُ أَن يُطْعِمُونِ

**Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım! Mən onlardan ruzi istəmirəm. Mən onlardan Məni yedirtmələrini də istəmirəm!**
*(Zəriyət, 56-57)*

Allah səni Adəm övladlarından bəzilərinin etdiyi kimi, nəsə əldə etmək, nailiyyətlər qazanmaq, hansısa peşə ilə məşğul olmaq və Onun üçün mal-dövlət toplamaq üçün yaratmayıb. Yox. Allah bütün bunlardan zəngindir. Allah aləmlərdən zəngindir. Buna görə Allah deyir: **“Mən onlardan ruzi istəmirəm və Məni yedizdirmələrini də istəmirəm”** – çünki Allah ruzi verir, amma Özü qidalanmır. Allah bütün bunlardan zəngindir, Onun Ona ibadət edilməsinə də ehtiyacı yoxdur, hətta küfr etsələrdə, bunun Onun sahib olduqlarına heç bir təsiri olmayacaq. Yalnız sənin Ona ehtiyacın var, sənin bu ibadətə ehtiyacın var, Onun lütfüdür ki, sənə ibadət etməyi buyurur, bu sənin xeyirin üçündür. Çünki əgər ibadət etsən, Allah Subhanə və Təala Öz lütfünü bəxş edəcək, belə ki, ibadət – bu və o biri dünyada bəxşiş verilməsi üçün səbəbdir. Beləliklə,

kim ibadətdən fayda əldə edir? Əlbəttə ki, qul (insan), halbuki Allah bütün yaradılmışlardan zəngindir.

**Sən başa düşdün ki, Allah insanları Ona ibadət etmək üçün yaradıb, əgər deyəcəyimiz iki şərt olmazsa, o ibadət düzgün – Allahın razı qalacağı ibadət sayılmır. Əgər bu şərtlərdən biri pozulsa, ibadət batil olur:**

---

**Birinci**: İbadətdə şirk olmalı deyil, Uca Allaha qarşı ixlaslı olmalıdır. Çünki ibadətin şirk ilə qarışması onu batil edir, necə ki, təharət natəmizlik ilə qarışanda pozulur. Eləcə də, əgər Allaha ibadət edib sonra Ona şərik qoşsan, bu ibadət öz əhəmiyyətini itirir.

**İkinci:** İbadət Peyğəmbərimizin (صلى الله عليه و سلم) sünnəsinə əsaslanmalıdır, onun etmədiyi hər bir ibadət batildir və rədd edilir, çünki bidət və nəfsin istəyinə əsaslanır. Necə ki, Rəsulullah (صلى الله عليه و سلم) bu hədisdə buyurur:

من عمل عملا ليس عليه أمرنا فهو رد

**Hər kim bizim əmr etmədiyimiz hər hansı bir əməli etsə, o rədd ediləcək**

*(Müslim (1718) Aişədən (Allah ondan razı olsun) rəvayət etdi).*

Yəni vacibdir ki, ibadət peyğəmbərin (صلى الله عليه و سلم) sünnəsinə uyğun olsun, insanların xoş niyyətlərinə, fikirlərinə və arzularına əsaslanmasın. Əgər onun gətirdiyi şəriətə əsaslanmırsa, o, bidət sayılır ki, bu da onu edənə fayda deyil, zərər verir. Belə ki, əməl sahibi günah edir və elə zənn edir ki, əməli ilə Allaha yaxınlaşır.

Düzgün sayılması və sahibinə fayda verməsi üçün vacibdir ki, ibadət bu iki şərti özündə birləşdirsin: ixlas və peyğəmbərimizin (صلى الله عليه و سلم) sünnəsinə əsaslanmaq. Əgər ona şirk qatılsa, batil olar. Həmçinin bidət əməl olsa, yenə də batil olacaq. Əgər bu iki şərt olmasza, ibadətin heç bir faydası yoxdur, çünki Allahın buyurduğu kimi deyil. Allah Öz Kitabında və Peyğəmbərinin (صلى الله عليه و سلم) dili ilə buyurduqlarından başqa heç bir ibadəti qəbul etmir.

Allahın rəsulundan (صلى الله عليه و سلم) başqa elə bir insan yoxdur ki, onun yolunu davam etdirmək vacib olsun. Ondan başqasına isə o halda tabe olmaq olar ki, o kəs peyğəmbərə (صلى الله عليه و سلم) əks heç nə etməsin, əks halda tabe olmaq olmaz. Uca Allah buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا أَطِيعُوا اللَّهَ وَأَطِيعُوا الرَّسُولَ وَأُولِي الْأَمْرِ مِنكُمْ

**Allaha, Rəsula və özünüzdən olan əmr sahiblərinə itaət edin!**

*(Nisa, 59)*

Əmr sahibləri: hakim və alimlərdir. Əgər onlar özləri Allaha tabe olurlarsa, onlara tabe olmaq və onların dediklərinə əməl etmək vacibdir. Yox əgər onlar Allahın buyurduğlarına tabe olmurlarsa, tabe olmadığları məsələlərdə onlara tabe olmaq olmaz.

**Əgər bildinsə ki, şirk ibadət ilə qarışanda onu məhv edir və bu əməl sahibi əbədi olaraq Cəhənnəmə məhkumdur, o zaman bu məsələnin vacibliyi sənə aydın olar. Qoy Allah səni şirkdən qorusun. Necə ki, Uca Allah bu ayədə buyurur:**

---

إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَٰلِكَ لِمَن يَشَاءُ

**Həqiqətəndə , Allah Özünə şərik qoşanları bağışlamaz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar**

*(Nisa, 48)*

**Allahın Quranda xatırlatdığı bu dörd qayda buna əsaslanır.**

---

Allahın ibadətdə təklənməsi olan tövhidi bilməyin yetərli deyil, həmçinin şirkin nə olduğunu da bilməyin vacibdir. Çünki şirkin nə olduğunu bilməyən kəs ona düçar ola bilər. Həmçinin şirkin növlərini də bilmək vacibdir ki, ondan uzaqlaşasan.

Bu, şirkin ciddi məsələ olmasıdır, hansı ki, bu əməl sahibinə Cənnət haramdır.

إِنَّهُ مَن يُشْرِكْ بِاللَّهِ فَقَدْ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ وَمَأْوَاهُ النَّارُ

**Allaha şərik qoşana Allah, şübhəsiz ki, Cənnəti haram edər**

*(Maidə, 72)*

Və bağışlanma yoxdur.

# Birinci qayda

**Bil ki, peyğəmbərin (صلى الله عليه و سلم) vuruşduğu kafirlər etiqad edirdilər ki, Allah Yaradandır, kainatı idarə edəndir, lakin bununla bərabər, islama daxil olmadılar.**

---

Buna dəlil Uca Allahın sözləridir:

قُلْ مَن يَرْزُقُكُم مِّنَ السَّمَاءِ وَالْأَرْضِ أَمَّن يَمْلِكُ السَّمْعَ وَالْأَبْصَارَ وَمَن يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ
وَيُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ وَمَن يُدَبِّرُ الْأَمْرَ ۚ فَسَيَقُولُونَ اللَّهُ ۚ فَقُلْ أَفَلَا تَتَّقُونَ

**Ya Rəsulum! De: “Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan (onları yaradan) kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan (səhmana salan) kimdir? Onlar: “Allahdır!” – deyəcəklər. De: “Bəs onda Allahdan qorxmursunuz?”**

*(Yunus, 31)*

---

Bu islam dininin ən mühüm qaydalarındandır, hansıları elm tələbəsi başa düşməlidir ki ibadət və tövhidin mənasını düzgün dərk etsin. Bu o tövhiddir ki, Allah ona görə kitablar nazil edib və rəsullar göndərib. Əhli Sünnə vəl Cəmaa alimləri tövhid elmini 3 (üç) qismə bölümlər

1. Tövhid rububuiya
2. Tövhid uluhiya
3. Ad və sifətlər tövhidi

Bu iki qismdə olan fərqi başa düşmək üçün (rububiya və uluhiya) biz bu sözlərin lüğəti mənalarına müraciət etməliyik.

Rububiya – “rabbə” (ربَّ) sözünün masdarıdır. Ərəb dili lüğəti kitabında (Məqayisi lüğə) – nəisə düzəldən, islah edən, və onun üzərində olan. Rəbb – yəni Mülk Sahibi, Xaliq, nəyəsə sahib olan. Allah Subhanə və Təalə öz məxluqların hallarını düzəldəndir.

Rəbb sözünün şəriət tərifini şeyxul-islam İbn Qayyim Al-Cauziya (رحمه الله تعالى) verib (“Bədəi fauaid”) – (“Misli olmayan faydalar”):

**Rəbb** – Seyiddir, Mülk sahibidir, Nemət verəndir, tərbiyə edəndir. İslah edəndir.
Və Uca Allah əlbəttə ki bütün bu tariflərlə adlandırılır.

İbn Qayyim (رحمه الله تعالى) bu təriflərinə əlavə etmək olar ki Rəbb həyat verən və həyatdan məhrum edəndir, halal edən və haram edəndir. Və bu mənaları heç bir məxluqa vermək olmaz.

Və o müşriklər ki Rəsulullah (صلى الله عليه و سلم) onlara islam dinilə göndərilmişdir bütün bu mənaları təsdiq edib iqrar edirdilər.  Yəni onlar, Allaha rububiyyə tövhidində şərik qoşmurdular. Yaradılmışlardan elə bir kəs yoxdur desin ki, Allahla bərabər kimsə yaradır, ruzi verir, həyat verib, alır (ateist, kommunistlərdən başqa). Və müşriklər də buna inanırdılar.

**Uca Allah belə deyib:**

وَلَئِن سَأَلْتَهُم مَّنْ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ لَيَقُولُنَّ اللَّهُ ۚ

**Həqiqətən, əgər sən müşriklərdən: “Göyləri və yeri kim yaratmışdır?” – deyə soruşsan, onlar mütləq: “Allah!” – deyə cavab verəcəklər.**

*(Loğman, 25)*

قُلْ مَن رَّبُّ السَّمَاوَاتِ السَّبْعِ وَرَبُّ الْعَرْشِ الْعَظِيمِ ﴿٨٦﴾ سَيَقُولُونَ لِلَّهِ ۚ قُلْ أَفَلَا تَتَّقُونَ

**De: "Yeddi qat göyün Rəbbi, o böyük əzəmətli ərşin Rəbbi kimdir?" Müşriklər mütləq: "(Bunlar) Allahındır!" – deyə cavab verəcəklər.**

*(Muminun, 86-87)*

Bütün bu ayələr göstərir ki, müşriklər rububiyyə tövhidinə inanırdılar.

Və peyğəmbərin (صلى الله عليه و سلم) vuruşduğu kafirlər rububiyyə tövhidini qəbul edirdilər, lakin bununla yanaşı tövhid uluhiyanı inkar və rədd edirdilər, ad və sifətlər tövhidinidə rədd edirdilər, ona görə də islama daxil olmadılar. Onların qanı və malı haram deyildi. Bu o deməkdir ki, tövhid – yalnız rübubiyyə tövhidinin təsdiqi deyil, həmçinin şirk anlayışı da təkcə rübubiyyə tövhidində şirki əhatə etmir. Rübubiyyə tövhidinə bütün ümmətlər inanmışlar, rübubiyyə tövhidi – Allahın Yaradan, Ruzi Verən, Həyat verən və Həyat alan, işləri idarə edən olmasını təsdiqi etməkdir.

Fəlsəfə alimləri isə deyirlər insan həddi buluğa çatandan sonra aləmə nəzər salır və dərk edir ki, bu kainətin Yaradıcısı var. Və beləliklə Rəbbi iqrar edir. Yəni onlarda Rububiyaya iman aləmə nəzər yetirəndən sonra əldə olunur. Əhli sünnə vəl Cəmaa etiqadına görə isə Rububiyaya iman fitri olaraq insanda yaranır

فَأَقِمْ وَجْهَكَ لِلدِّينِ حَنِيفًا ۚ فِطْرَتَ اللَّهِ الَّتِي فَطَرَ النَّاسَ عَلَيْهَا ۚ

**Ya Rəsulum! Ümmətinlə birlikdə batildən haqqa tapınaraq pak bir müvəhhid, xalis təkallahlı kimi üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə tərəf tut**

*(Rum, 30)*

Fəlsəfə alimləri (mutəkəllimlər) əqidəsinə fikir versən, görərsən ki, onlar iddia edirlər ki, tövhid – Allahın Ruzi Verən, Həyat verən və Həyat alan olmasını təsdiq etməkdir.

Onlar deyirlər – Allah mahiyyətində Təkdir, işlərində Təkdir, Ad və Sifətlərində Təkdir, heç kim Onunla müqayisə edilə bilməz. Bu – elə rübubiyyə tövhididir. Onların istənilən bir kitabını götürün, görərsiniz ki, onlar rububiyyə tövhidi çərçivəsindən kənara çıxmırlar. Lakin Allah elçilərini tövhidin bu növü üçün göndərməyib. Və təkcə onun təsdiqi təsdiq edənə fayda vermir. Çünki bunu müşriklər və onları küfrə aparanlar da qəbul edirdilər. Lakin küfrdən çıxmadılar və islama daxil olmadılar. Bu – əqidədə böyük xətadır və kim bu əqidədədirsə, onun əqidəsi Əbu Cəhlin və Əbu Ləhəbin əqidəsindən fərqlənmir. Günümüzdə bir çox elm iddia edənlər bunun üzərindədirlər – rububiyyə tövhidinin təsdiqi və Uluhiyyə tövhidini dərk etmirlər. Tövhid adlandırılmaqda böyük xətadır.

Onu da bilin ki, bu qayda – tövhid rububiyanın əsası - Quranı Kərimdə bir çox ayələrdə öz təsdiqini tapıb.

Məsələn, Uca Allah buyurur:

وَالَّذِينَ اتَّخَذُوا مِن دُونِهِ أَوْلِيَاءَ مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا الى الله زلفى

**Allahı qoyub özlərinə dost tutanlar: “Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!” -deyirlər.**

*(Zumər 3)*

Uca Allahın bu ifadəsinə fikir verin – dost tutanlar (övliyalar), bu ifadəni müşriklər həmişə işlədirlər. Onlar Allahdan başqa ibadət edənləri övliyalar adlandırır. Onlar dostluğu belə edirlər, həmin övliyaları Allaha ibadətdə şərik qoşurlar.

Lakin Allah deyir

فَاللَّهُ هُوَ الْوَلِيُّ وَهُوَ يُحْيِي الْمَوْتَىٰ وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ

**Yalnız Allahdır dost, O ölünü dirildən və hər şeyə gadirdir**

*(Zumər, 4)*

Allah Subhanə və Təalə  Öz qulların həqiqi dostudur, həqiqi dosluq yalnız Allahdadır.

Bes bunların ehtiyacı nədir? Niyə görə övliyaları Allahdan başqa özlərinə dost tuturlar? Onlar övliyaları Rəbbin sifətlərilə vəsf etmirlər, yuxarıda zikr etdiyimiz sifətləri Allahda iqrar edirlər. Onlar bunu yaxşı bilirlər. Onlar özlərinə bu iddia ilə bəraət qazandırmaq istəyirlər.

وَالَّذِينَ اتَّخَذُوا مِن دُونِهِ أَوْلِيَاءَ مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا الى الله زلفى

**"Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"  -deyirlər.**

*(Zumər 3)*

Və bu hər biz zamanda və hər bir məkanda olan müşriklərin hüccəsidir. Onlar Allaha Tövhid Uluhiyada şərik qoşurlar, yəni ibadətdə. Və şübhəsiz ki,  bu xarab bir əqidə və etiqatdır. Deyirlər ki, Allah duaları övliayalrsız qəbul etmir, Allahdan köməyi onların vasitəsi ilə istəmək lazımdır. Onlarla təvəssül etmək olar. Onlardan şəfaət diləmək olar. Və islmadan uzaq olan bir əqidədir.

Şirk barədə onlar belə deyirlər: şirk – Allahdan başqasının Yaratmasına, Ruzi Verməsinə, Həyat verib almasına inanmaqdır. Deyirik: Bu, Allahdan başqa Yaradan, Ruzi Verən olmadığını deyən Əbu Cəhl və Əbu Ləhəbin əqidəsidir.

Şəkk yoxdur ki, Allah ona təvəssül etməyi sevir, lakin Ona təvəssül Onun şəriəti çərçivəsində olunmalıdır. Mələk vasitəsilə yox, ağac, daş, vasitəsilə yox, övliyalar vasitəsilə yox. Allaha Onun ad və sifətlər vasitəsilə təvəssül etmək olar, saleh əməllər vasitəsilə.

**Xulasə.** Bütün bu ayələr bu qaydanı isbat edir, və bu odur ki – müşriklər Allaha Rububiyə Tövhidində küfr etmirlər, onlar Allaha Ona Tək ibadətə laiq olmağında küfr edirlər. Və biz bu qaydanı yadda sxlamalıyıq, ki dinimizin əsasını bilək və əqidəmizdə möhkəm olaq, dəvətimisdə, və bidət firqələrinə hüccəti qaldıra bilək.

# İkinci qayda

**<u>Onlar deyirlər:</u> "biz onlara dua edirik və Allah qarşısında yaxınlaşma və şəfaət etmələri üçün onlara nəzərimiz salırıq".**

ۚ وَالَّذِينَ اتَّخَذُوا مِن دُونِهِ أَوْلِيَاءَ مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَىٰ إِنَّ اللَّهَ يَحْكُمُ

بَيْنَهُمْ فِي مَا هُمْ فِيهِ يَخْتَلِفُونَ ۗ إِنَّ اللَّهَ لَا يَهْدِي مَنْ هُوَ كَاذِبٌ كَفَّارٌ

**Allahı qoyub özlərinə övliyalar (dostlar) tutanlar deyir: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!". Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində onların arasında hökm edəcəkdir. Allah yalançı, kafir kimsəni doğru yola müvəffəq etməz!**

*(Zumər surəsi, 3)*

**Və şəfaət tələb edənlər haqqında Allah belə deyib:**

وَيَعْبُدُونَ مِن دُونِ اللَّهِ مَا لَا يَضُرُّهُمْ وَلَا يَنفَعُهُمْ وَيَقُولُونَ هَٰؤُلَاءِ شُفَعَاؤُنَا عِندَ اللَّهِ

**Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilməyənlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!" – deyirlər.**

*(Yunus, 18)*

**Nəfy olunmuş şəfaət və təsdiq olunmuş səfaət. Nəfy olunmuş o şəfaətdir ki Allahdan başqasından tələb olunur, və o kəs gadir deyil şəfaətçi olsun.**

**Bu barədə Allah belə deyib**

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا أَنفِقُوا مِمَّا رَزَقْنَاكُم مِّن قَبْلِ أَن يَأْتِيَ يَوْمٌ لَّا بَيْعٌ فِيهِ وَلَا خُلَّةٌ وَلَا شَفَاعَةٌ ۗ وَالْكَافِرُونَ هُمُ الظَّالِمُونَ

**Ey iman gətirənlər! Alış-verişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün (qiyamət günü) gəlməmişdən əvvəl sizə verdiyimiz ruzidən paylayın! Kafirlər isə özlərinə zülm edənlərdir!**

*(Bəqarə, 254)*

**Təsdiq olunmuş şəfaət isə Allahdan tələb olunan şəfaətdir. Şəfaətçi Allahın dərgahında şərəfli və hörmətlidir həmin şəfaətçıdən və şəfaət olunanlardanda Allah razıdır, onların sözlərindən, əməllərindən, və bu şəfaət yalnız Allahın iznilə olur.**

**Bu barədə Allah belə deyib**

مَن ذَا الَّذِي يَشْفَعُ عِندَهُ إِلَّا بِإِذْنِهِ

**Onun hüzurunda kim izn olmadan şəfaət edə bilər**

*(Bəqarə surəsi, 255)*

Bu ikinci qayda birinci qaydanını mütəmadi olaraq tamamlayır və müşriklərin şirkə qovuşmasının səbəblərini bəyən edir. Və onların şübhələrini açıqlayır. Birinci qaydadan bizə bəyən oldu ki, onlar Allahın tövhid Rububiya haqqda iqrarlıdırlar (Allah Yaradandır, Ruzi Verəndir, Həyat verən və alandır). Bes onda Allaha niyə şərik qoşursuz?! Deyirlər

مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَىٰ

**"Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"**

Və onlara ibadət Allaha yaxınlaşmaq məqsədi, şəfaət tələb etmək və onları vasitə kimi istifadə etməkdir. Onlar etiqad edirlər ki, məbudları xeyr və zərər vermir, ona görə yox ki, bunlar yaradır, ruzi verir, ona görə ki, onlar Allahla özləri arasında vasitəçidirlər, Allah yanında onlar üçün şəfaətçidirlər. Bu – müşriklərin əqidəsidir.

Onların bir tayfası məbudlarına müstəqil olaraq ibadət edirlər. Vasitəçilk səbəbdən yox, eyni zamanda onlar etiqad etmirlər ki həmin məbudlar yaradır, ruzi verir, kainatın işlərini idarə edir. Məsələn, nəsranilər. Onlar İsə ibn Maryama (عليه السلام) məs belə ibadət edirlər. Ondan vasitəçilik və şəfaət tələb edirlər. Onlarda Məsih ibn Məryam (عليه السلام) üçlüyün biridir. Bəzilər etiqad edir ki Məsih Allahdır. Beləliklə onlar müstəqil olaraq Məsihə ibadət edirlər. Bəzilər isə etiqad edir ki Məsih Allahın oğludur, ona görə də ata kimi ibadətə laiqdir. Ataya və oğula ibadət edirlər. Onlar Allaha ibadətdə şərik qoşurlar və müstəqil olaraq həmin şərikə ibadət edirlər. Həmçini Məryamada (عليه السلام) ibadət edirlər, çünki o Allahın oğlunu bətnində qezdirirdi, ona görədə ibadətə haqqı var.

Allah Quranı Kərimdə belə deyir

وَيَعْبُدُونَ مِن دُونِ اللَّهِ مَا لَا يَضُرُّهُمْ وَلَا يَنفَعُهُمْ وَيَقُولُونَ هَٰؤُلَاءِ شُفَعَاؤُنَا عِندَ اللَّهِ

**Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərə ibadət edir və deyir: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!**

*(Yunus surəsi, 18)*

Etiqad edirlər ki onların məbudları şəfaət edəndir, və Allahın dərgahında şəfaət diləyəcəklər bunlar üçün.

Şəfaət sözünün mənasın başa düşmək üçün lüğətə muraciət edirik (Məqayisi luğa) "şəf" feylin masdarıdır. Səf etmək – yəni yaxınlaşdırmaqdır. Birdə təklik mənasını daşıyır – cütlüyün əksini təşkil edir.

Şəriətdə şəfəat – şəfəat tələb edənin başqasına xeyr tələbidir. Başqa tərifdə işlətmək olar – şəfaət – şəfa edənin başqası üçün xeyr cəlb etmək məqsədilə yaxud şərri dəf etmək məqsədilə vasitəçiliyidir.

Və şəriətdə şəfaət iki cür olur – nəfy olunmuş və təsdiq olunmuş.

**Təsdiq olunmuş şəfaətin şərtləri Allah Subhanə və Təalə Quranda bəyən edib:**

1. Allahın izni

مَن ذَا الَّذِي يَشْفَعُ عِنْدَهُ إِلَّا بِإِذْنِهِ

**Onun hüzurunda kim izn olmadan şəfaət edə bilər**

*(Bəqarə surəsi, 255)*

2. Şəfaət olunanlardan Allah razı olmalıdır

وَلَا يَشْفَعُونَ إِلَّا لِمَنِ ارْتَضَىٰ وَهُم مِّنْ خَشْيَتِهِ مُشْفِقُونَ

**Onlar yalnız Allahın razı olduğu kəslərdən ötrü şəfaət edə bilər**

*(Ənbiyyə, 28)*

3. Şəfaət edənin qüdrəti olmalıdır şəfaəti tələb etmək üçün, və bu qüdrət Allahın iznilə olan şəfaətdə olur. Bu şərt birinci şərtlə bilavasitə bağlıdır. Buna dəlalət edən Allahın bu ayəsidir

وَلَا يَمْلِكُ الَّذِينَ يَدْعُونَ مِن دُونِهِ الشَّفَاعَةَ إِلَّا مَن شَهِدَ بِالْحَقِّ وَهُمْ يَعْلَمُونَ

**Ondan qeyrisinə dua edənlər şəfaət edə bilməzlər, Ancaq haqqa şəhadət verənlər müstəsnadır**

*(Zuxruf, 86)*

Dünyasını deyişmiş övliyalarda, əməli saleh insan olub, sonra dünyasını deyişib və qəbirdə uyuyanlara Allah izn verməyib şəfaət etsin.

4. Kimə ki **ş**əfaət tələb olunur, islamda olmalıdılar, yəni tövhid əhli, muvahhid olmalıdırlar, çünki müşrik üçün olunan şəfaətin heç bir faydası yoxdur, necə ki Uca və Cəlal Allah bu ayədə deyib

مَا لِلظَّالِمِينَ مِنْ حَمِيمٍ وَلَا شَفِيعٍ يُطَاعُ

**O gün zalımların nə bir dostu, nə də sözü keçən bir şəfaətçisi olar!**

*(Qafir, 18)*

Onlar bunu şəfaət tələbi adlandırırlar, lakin şəfaətin mənasını bilmirlər. Allahın izni olmadan edirlər, belə ki, müşrikin şəfaətçiliyi faydasızdır, batil şəfaəti həqiqi şəfaət kimi təqdim edirlər.

Yaradılmışlardan ən xeyirlisi və rəsulların ən sonuncusu (صلى الله عليه و سلم) Qiyamət günündə öz ümməti üçün şəfaət diləmək istədikdə, Allah qarşısında səcdə edəcək, Ona dua edəcək və Ona təriflər söyləyəcək. Səcdədə olduğu halda ona deyiləcək:

يا محمد ارفع رأسك سل تعطه واشفع تشفع

**Ya, Muhəmməd, başını qaldır və tələb et, veriləcək sənə, şəfaət tələb et, və şəfaətin qəbul olunacaq**

*(at–Tirmizi rivayət edib)*

Bu şərtlərə uyğun olmayan şəfaət nəfy olunmuşdur, səhih deyil, yəni Allah belə şəfaəti qadağan edib. Birdə şəfaəti ona gadir olan məxluqdan tələb edərlər. Yəni əgər sən günahların bağışlanmasını o kesdən tələb edirsən ki ona gadir deyil, gadir deyil sənin tələblərini çatdırsın Allaha, və şəfaət etsin sənin üçün. Nə bu dünyada nə də Axirətdə. Və bu yuxarıdaki zikr etdiyimiz şərtlər təbii ki Axirətdə öz əksini tapacaq. Bu dünyada isə Allah Subhanə və Təalə heç kimə izn verməyib ki ondan şəfaət tələb etsin. Şəfaət tələbi Axirətdə olacaqdır, o zaman ki bütün məxluqlar Allah Subhanə və Təalənin hüzurunda olacaqlar və adilliyin hökmü sürəcəkdir. Allah o zaman rəsullara, peyğəmbərlərə, mələklərə və möminlərə izn verəcək şəfaət tələb etsinlər o keslərdən ki, onlardan razı qalıb bu həyatda.

Bu dünyada isə şəfaətin bir növü var – oda duadır.

Allah Quranda belə deyir

وَكَم مِّن مَّلَكٍ فِي السَّمَاوَاتِ لَا تُغْنِي شَفَاعَتُهُمْ شَيْئًا إِلَّا مِن بَعْدِ أَن يَأْذَنَ اللَّهُ لِمَن يَشَاءُ وَيَرْضَىٰ

**Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq Allah Öz istədiyi və razı olduğu kimsəyə izin verdikdən sonra.**

*(Nəcm surəsi, 26)*

Və bir çox mutavatir hədislərdə varid olunub ki, Axirət günü şəfaətə izn yalnız tövhid əhli üçün veriləcək, o keslər ki "Lə İləhə İllə Llah" üzərində dünyalarını deyişiblər.

Diqqətinizə bir şübhə üzərində olan fikirləri çatdırım, və bu şübhənin mənbəyi qədimidir, mötəzilə firqəsindən mənbələnir, hansılar ki, rəsullulahın (صلى الله عليه و سلم) Axirət günü olan şəfaətini inkar edirlər. Onlar deyir, əgər Allah kimdənsə razıdır, o kəsdən ki ona şəfəat tələb olunur, onda belə şəfaətin nə faydası var?

Şeyx Ubeyd Cabiri (حفظه الله), muasir Əhli Sünnə alimlərindəndir bu şübhəyə belə cavab verir:

"Belə şübhələri yaxud sünnədən xəbərsiz olan, Kitab və saleh sələflərin fəhmindən cahil bir insan yeridə bilər, yaxud da ki haqqa batil don geydirənlər və öz nəfslərinə tabe olanlar. Cavab odur ki, o keslər ki, Allah onlardan razıdır, və onlar tövhid əhlidir, tövhid üzərində dünyalarını deyişiblər, onların Cəhənnəmə şirkdən başqa günahlara görə Allahın qəzəbinə məruz qalıb, daxil ola bilərlər ki əzablara düçar olsunlar. Və Allahın bu qəzəbi muvahhidlərə qarşı kafirlərə və munafiqlərə kimi deyil, bu tayfa insanlar şəfaətdən məhrumdular. Onlara bu şəfaətdən heç bir pay yoxdur.

Həmin bu şəfaət o keslər üçün baş tutacaqdır ki, onlardan Allah Subhanə və Təalə onların tövhid əhli olduğlarına görə, onların tövhid üzərində, iman üzərində dünyalarını deyişmələrinə görə razıdır, lakin onlar öz həyatları boyu gunahlar işlədiblər, və bu gunahlara görə onlar əzaba düçar ola bilərlər, Allah istəsə, lakin Allah onlara görə mələklərə, peyğəmbərlərə, əməlisaleh qullarına izn verəcək ki onlar üçün Axirət günü şəfaət tələb etsinlər. Onlardan helələri olacaqdır ki onların şəfaəti tam təmin olunacaq, qəbul olunacaq, helələri də olacaqdır ki, onların günhalarının bəziləri bağışlanacaq, bəzilərinə isə bir müddətli əzab veriləcək Cəhənnəmdə"

Kələmin sonu

# Üçüncü qayda

**Peyğəmbərin (صلى الله عليه و سلم) zamanında insanlar müxtəlif idilər ibadətlərində. Kimi mələklərə ibadət edirdi, kimi peyğəmbər və salehlərə, kimi daş və ağaclara, kimi isə günəşə və aya ibadət edirdi. Peyğəmbər (صلى الله عليه و سلم) onlar arasında fərq qoymadan hamı ilə vuruşurdu. Buna dəlil Allahın bu ayələridir**

قَاتِلُوهُمْ حَتَّىٰ لَا تَكُونَ فِتْنَةٌ وَيَكُونَ الدِّينُ كُلُّهُ لِلَّهِ

---

**Yer üzündə fitnə qurtarana qədər, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun**

*(Ənfəl, 39)*

**Günəş və ayın dəlili**

وَمِنْ آيَاتِهِ اللَّيْلُ وَالنَّهَارُ وَالشَّمْسُ وَالْقَمَرُ ۚ لَا تَسْجُدُوا لِلشَّمْسِ وَلَا لِلْقَمَرِ وَاسْجُدُوا لِلَّهِ الَّذِي خَلَقَهُنَّ إِن كُنتُمْ إِيَّاهُ تَعْبُدُونَ

---

**Gecə və gündüz, günəş və ay Onun ayələrindəndir. Günəşə və aya səcdə etməyin, onları yaradan Allaha səcdə edin! Əgər Ona ibadət edirsinizsə**

*(Fussilət, 37)*

**Mələklərə dəlil**

وَلَا يَأْمُرَكُمْ أَن تَتَّخِذُوا الْمَلَائِكَةَ وَالنَّبِيِّينَ أَرْبَابًا

---

**O sizə mələkləri və peyğəmbərləri özünüzə Rəbb qəbul etməyi əmr etmir**

*(Əli İmran, 80)*

---

## Peyğəmbərlərə dəlil

وَإِذْ قَالَ اللَّهُ يَا عِيسَى ابْنَ مَرْيَمَ أَأَنتَ قُلْتَ لِلنَّاسِ اتَّخِذُونِي وَأُمِّيَ إِلَٰهَيْنِ مِن دُونِ اللَّهِ ۖ قَالَ
سُبْحَانَكَ مَا يَكُونُ لِي أَنْ أَقُولَ مَا لَيْسَ لِي بِحَقٍّ ۚ إِن كُنتُ قُلْتُهُ فَقَدْ عَلِمْتَهُ ۚ تَعْلَمُ مَا فِي نَفْسِي
وَلَا أَعْلَمُ مَا فِي نَفْسِكَ ۚ إِنَّكَ أَنتَ عَلَّامُ الْغُيُوبِ

---

**Ya Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahla yanaşı, məni və anamı da özünüzə tanrı bilin!" – demişdin? İsa cavabında deyəcək:" Sən pak və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu mən demiş olsaydım, Sən onu mütləq bilərdin. Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatında olanı bilmərəm. Şübhəsiz ki, qeybləri bilən ancaq Sənsən!**

*(Məidə, 116)*

## Salehlərə dəlil

أُولَٰئِكَ الَّذِينَ يَدْعُونَ يَبْتَغُونَ إِلَىٰ رَبِّهِمُ الْوَسِيلَةَ أَيُّهُمْ أَقْرَبُ وَيَرْجُونَ رَحْمَتَهُ وَيَخَافُونَ
عَذَابَهُ

**O kəslər ki, siz onlara dua edirsiniz, özləri hər hansı biri Allah dərgahına daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır, Onun rəhmətini umur, əzabından qorxur**

*(İsra, 57)*

---

## Daşlara və ağaclara dəlil

---

أفـر أيـتـم الـلات و الـعزى ومنـا ة الـثا لـثة الأخرٰى

**Bir deyin görək Lat və Uzza ni qadirdilər?!**

**Digər üçüncü olan Mənat da həmçinin?!**

*(ən-Nəcm, 19-20)*

---

Bu üçüncü qaydada müəllif çox mühüm bir məsələni, müşriklərin halı ilə bağlı bir məsələni açıqlayır. Bu qaydanın şərhində görkəmli sünnə alimi şeyx ibn Bəz (رحمه الله) bunları deyir:

Peyğəmbər (صلى الله عليه و سلم) zamanında insanlar onlara məxsus şirkə görə müxtəlif idilər ibadətlərində, onlardan kimisə peyğəmbərlərə ibadət edirdilər, kimisə - mələklərə, kimisə - salehlərə, kimisə - cinlərə, kimisə - daşlara və ağaclara, kimisə günəşə və ayə. Onların hamısılə vuruşurdru Peyğəmbər (صلى الله عليه و سلم). Ondan sonrada sahəbələr vuruşurdu. Və bu məbudların müxtəlifliyi onlara qarşı hökmü deyişmir. Onların hamısının hökmü birdir – onlar hamısı müşrikdirlər. Fərq etməz, peyğəmbərlərə ibadət edən, ağaca, yaxudda ki qəbirə ibadət edənlər arası, əgər ibadət Allahdan başqasına yönəlibsə, həmin ibadət şirkdir. Və ibadət sayılmır. Hətta Allahın elçisinə və rəsuluna yönəlibsə.

Bəzi insanlar zənn edirlər ki, onlar ibadətlərini Rəsul Allaha (صلى الله عليه و سلم) yaxud salehlərə yönəldirlərsə belə ibadət qadağan olunan şirkdən istisnadır. Deyirlər: biz heçnə etmirik, sadəcə Rəsul Allahı (صلى الله عليه و سلم) sevirik, amma onların sevgiləri ibadət həddinə çatıb. Onlara deyəndə, ki bunlar hamısı böyük şirkdəndir, salehlərə dua etmək, onlardan nəisə tələb etmək, kömək diləmək, deyirlər: “Sən bizi ağaca və daşa ibadətlərnən bir edirsən? Daşları salehlərlə bir edirsən? Bizim salehlərin qəbirləinə yönəlməyimiz, və onlardan tələblərimiz, şəfa diləməyimiz onlara böyük sevgimizdən irəli gəlir, biz onları sevirik, onlara ibadət etmirik”

Lakin bu kələmlərin heç bir qiyməti yoxdur, çünki hansısə əmələ, hadisəyə qiymət onun adlandırlımasından aslı olmayaraq, onun mahiəti və həqiqətinə görə verilir.

Biz onlara deyirik ki, nə özünü nə də ki insanları aldatmayın, sizin etdiyiniz əməllər həm lüğətdə həmdəki şəriətdə ibadət adlandırılır. Və siz şirkdən xilas olmamısınız, böyük şirk edirsiniz, və siz bütlərə ibadət edən, ağaclara və daşlara ibadət edən kimisiniz. Allahın dərgahında sizin hökmünüz birdir. Siz Allahı Onun məxluqu ilə bir edirsiniz. Hətta həmin o məxluq, salehlər olsun, Əhli Beytdən olsun, yaxudda Rəsul Allah (صلى الله عليه و سلم) olsun.

Şirkin mənfi cəhəti və batilliyi ondadır ki, şirki tərcih edənlər ibadətlərində fərqlənirlər və onları vahid norma, qayda birləşdirmir, çünki vahid əsas üzərində getmirlər. Nəfslərinə və öz yolunu azmış dəvətçilərin dəvətinə əsaslanaraq hərəkət edirlər, ona görə də, parçalanmaları daha da artır. Kim Tək Allaha qoruyan, pisliklərdən uzaqlaşdıran tək Hakim kimi ibadət edirsə, bunun istək və tələblərini bilir. Lakin bir neçə ağası olan kəs bilmir ki, onlardan hansı ondan razı qalacaq. Onlardan hər birinin öz tələbləri var.

Müşriklər öz ibadətlərində fərqlənirdilər və peyğəmbər (صلى الله عليه و سلم) aralarında fərq qoymadan onların hamısı ilə vuruşurdu – bütpərəstlərə, xristian və yəhudilərə, məcusilərə, mələklərə ibadət edənlərə, peyğəmbər və övliyalara ibadət edənlərə, bir sözlə, bütün müşriklərə qarşı vuruşurdu.

**Uca Allah belə deyir:**

قَاتِلُوهُمْ حَتَّىٰ لَا تَكُونَ فِتْنَةٌ وَيَكُونَ الدِّينُ لِلَّهِ

**Fitnə aradan qalxana qədər və din ancaq Allaha məxsus edilənədək onlarla vuruşun.**

*(Bəqərə, 193)*

---

Bu ayə əmrdir Allah Subhanə və Təalə tərəfindən, Onun Rəsuluna və ondan sonra gələn hakimlərə, hansılar ki müşriklərlə vuruşmağa imkanları var, bütün növ

müşriklərnən, bütün toplumlarla, şirkləri hansı surədə olursa olsun. Və Rəsul Allah (صلى الله عليه و سلم) heç bir topluma istisna etmirdi, demirdi, məsələn, mələklərə və cinlərə ibadət edənlərlə işiniz olmasın, onlarla vuruşmayın, yalnız Məkkə ətrafı daşdan düzəldilmiş bütlərə ibadət edənlərə vuruşun. Yox. Fərq qoymurdu. Kim Tək Allahı haqq məbud kimi qəbul etmirdi, onların hamısılə vuruşurdu.

## Fitnə aradan qalxana qədər

Sələf mufassirlərin təfsirindən byən olub bu ayədə ki "fitnə" – yəni şirk, yəni yer üzündən şirk aradan qalxana qədər. Vuruşmağın məqsədi yalnız Yer kürəsini şirkdən təmizləməkdir. Və bu niyyət hər bir müsəlmnalara vacibdir. Hər müsəlman savaşa qalxanda bu niyyətlə vuruşmalıdır, vətən üçün yox, qövm üçün yox, hansısə batil şuarlar və məqsədlər üçün yox, savaşın məqsədi yalnız yaşadığı yerin, yurdun şirkdən təmizlənməsi olmalıdır ki, Allahın kəlməsi yer üzündə ucalsın.

**Uca Allah Quranda deyir:**

وَمِنْ آيَاتِهِ اللَّيْلُ وَالنَّهَارُ وَالشَّمْسُ وَالْقَمَرُ ۚ لَا تَسْجُدُوا لِلشَّمْسِ وَلَا لِلْقَمَرِ وَاسْجُدُوا لِلَّهِ الَّذِي خَلَقَهُنَّ إِن كُنتُمْ إِيَّاهُ تَعْبُدُونَ

---

**Gecə və gündüz, günəş və ay Onun ayələrindəndir. Günəşə və aya səcdə etməyin, onları yaradan Allaha səcdə edin! Əgər Ona ibadət edirsinizsə**

*(Fussilət, 37)*

Niyə görə Allah Subhanə və Təalə ayə və günəşə ibadəti başqa məbudlara nisbətən xusui zikr edir?

Çünki ayə və günəşə ibadət o zamanki müşriklərdə məşhur idi, onlar günəşə və ayə secdə edirdilər. İmam Muslim (رحمه الله تعالى) "Səhih" hədsilər silsiləsində hədis rivayət edir Amr ibn Əbasa (رضي الله عنه) bu hədisi rivayət edir, belə başlıqladır bu fəsil: Amr ibn

Abasanın islamı. Hədisin məzmunu böyükdür, orada Amr ibn Əbasa (رضي الله عنه) Rəsul Allahdan (صلى الله عليه و سلم) tələb edir: məni onuilə tədrisləndir ki, mənə xeyr versin. Və Rəsul Allah (صلى الله عليه و سلم) əlbəttə ki ona cavab verdi və ona namazların vaxtları haqda təlimləndirdi. Sonra dedi:

صلّي الصبح حتى تطلع الشمس، حتى ترتفع في السماء، ثم أقصر عن الصلاة، فإنّ الشمس تطلع بين قرني شيطان و حينئذٍ يسجد لها الكفار

**Sabah namazını günəş qalxana gədər qıl, günəş səmaya qalxana gədər, sonra namazlarını dayandır, çünki günəş şeytanın buynuzlarının arasından qalxır, ona gorədə kafirlər ona səcdə edirlər**
*(Muslim)*

Və bu mövzuda başqa bir hədisdə günəşin batan zamanıda **şeytanın buynuzlarının arasından batır.**

İbn Rəcəb (رحمه الله تعالى) bu hədisi şərh edərkən (Fəthul Bəri) kitabında alimlərin bu hədis haqda olan ixtilafı zikr edib, və qeyd edib ki **şeytanın buynuzları** ifadəsində alimlərin iki rəyi mövcuddur.

1. **Şeytanın buynuzları** – mənası Şeytanın həqiqi buynuzalrıdı. İfadənin zahiri mənasından belə qənaətə gəlmək olar. Belə ki Şeytanın buynuzları var və onlar yalnız günəş qalxanda və batanda izhar olunur. Yəni Şeytan buynuzlarını yalnız günəş qalxanda və batanda izhar edir başqa vaxt izhar etmir.
2. Bağqa alimlərin rəyi odur ki, **şeytanın buynuz** mənası ümmətdir. Buynuzlar – ümmətlərdir. Və Şeytan onları günəşə və ayə səcdə etməklə zəlalətə düçar edir. Və buynuzu mənsub ediblər ümmətlərə.

İbn Rəcəb (رحمه الله تعالى) dediyi kimi belə təvil savabdan uzaqdır, birinci rəy isə savaba yaxındır.

İmam ən-Nəvəviy (رحمه الله تعالى) də bu rəydədir.

**Uca Allah deyir**

وَلَا يَأْمُرَكُمْ أَن تَتَّخِذُوا الْمَلَائِكَةَ وَالنَّبِيِّينَ أَرْبَابًا

---

**O sizə mələkləri və peyğəmbərləri özünüzə Rəbb qəbul etməyi əmr etmir**

*(Əli İmran, 80)*

İbn Kəsir (رحمه الله تعالى) bu ayənin təfsirində qeyd edib ki, yəni Allah sizə Allahdan başqasına ibadət etməyinizi əmr etmir, nə yaxın olan mələyə, nə göndərilmiş peyğəmbərə. Və bu mövcuddur müşriklərdə, nəsrani və yahudilərdə, və bu ümmətin bəzi tayfalarında onların yolunu gedənlərdə, peyğəmbərlərə ibadət edirlər, Rəsul Allaha (صلى الله عليه و سلم) ibadət edirlər.

**Allah Subhanə və Təalə belə deyir**

وَإِذْ قَالَ اللَّهُ يَا عِيسَى ابْنَ مَرْيَمَ أَأَنتَ قُلْتَ لِلنَّاسِ اتَّخِذُونِي وَأُمِّيَ إِلَٰهَيْنِ مِن دُونِ اللَّهِ ۖ قَالَ
سُبْحَانَكَ مَا يَكُونُ لِي أَنْ أَقُولَ مَا لَيْسَ لِي بِحَقٍّ ۚ إِن كُنتُ قُلْتُهُ فَقَدْ عَلِمْتَهُ ۚ تَعْلَمُ مَا فِي نَفْسِي
وَلَا أَعْلَمُ مَا فِي نَفْسِكَ ۚ إِنَّكَ أَنتَ عَلَّامُ الْغُيُوبِ

---

**Ya Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahla yanaşı, məni və anamı da özünüzə tanrı bilin!" – demişdin? İsa cavabında deyəcək:" Sən pak və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu mən demiş olsaydım, Sən onu**

**mütləq bilərdin. Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatında olanı bilmərəm. Şübhəsiz ki, qeybləri bilən ancaq Sənsən!**

*(Məidə, 116)*

Allah Subhanə və Təalə bizə bəyən edir ki, nəsranilər İsa ibn Maryamı (عليه السلام) və onun anasını özlərinə məbud və tanrı seçiblər. Və bu şirkin bir növü sayılır. Rəsul Allah (صلى الله عليه و سلم) məs bu şirkin məhv etməyi məqsədilə göndərilib elçi kimi Allah tərəfindən. O yalnız Qureyş müşrikləri səbəbindən, hansılar ki bütlərə ibadət edirdilər, göndərilməyib. Belə təsvir səhih deil. Bəzi elmsiz dəvətçilər məsələni belə təsvir edirlər. Bu iki səbəbdən irəli gəlir, elmsizlik nəticəsində, yaxudda ki hiyləbazlıq nəticəsi. Lakin Allah Quranda bizə şirkin bütün surələrini bəyən edib. Və İsa ibn Maryam (عليه السلام) onlara öz aidiyətsizliyini Axirət günü elan edəcəkdir. Necə ki bu dünyada, nə vaxt ki nazil olub xaçları sındıracaq, donuzları məhv edəcək, və Muhammməd (صلى الله عليه و سلم) şəriətinin yolunu gedəcəkdir, müsəlmanların imamı Muhammad ibn Abdullah (Mehdi) arxasında namaz qılacaq.

**Uca Allah deyir:**

أُولَٰئِكَ الَّذِينَ يَدْعُونَ يَبْتَغُونَ إِلَىٰ رَبِّهِمُ الْوَسِيلَةَ أَيُّهُمْ أَقْرَبُ وَيَرْجُونَ رَحْمَتَهُ وَيَخَافُونَ

عَذَابَهُ

**O kəslər ki, siz onlara dua edirsiniz, özləri hər hansı biri Allah dərgahına daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır, Onun rəhmətini umur, əzabından qorxur**

*(İsra, 57)*

Buxari və Muslim Səhih hədislər toplusunda ibn Masud (رضي الله عنه) hədis rivayət edir bu ayənin təfsirində.

Bir tayfa cin islamı qəbul etdi. Müşriklərdən olan ərəblərin bir hissəsi onlara ibadət edirdi. Cinlər islama daxil olandan sonra, onlar isə öz ibadətlərində qalmışdılar. Və Allah bu ayəni nazil etdi.

O muşriklər ki, Allahdan başqa cinləri məbud edərək, onları Rəbbə vəsilə axtarırdılar. Bu sözün leksik mənası – arzuya çatan hər hansı bir şeydir.

Möminlər isə vəsiləni saleh əməllərlə axtarır. Allahın razılığını qazanmaq üçün olan şey – Allaha vəsilədir (yaxınlaşma vasitəsidir). Bu vəsilə şəriətdə qəbul olunandır. Necə ki, bu barədə yuxarıdakı ayədə qeyd olunub.

---

Haqqı təhrif edənlər (muharrifun) deyirlər: vəsilə - özünlə Allah arasında zahid, övliya və ya ölülərdən bir vasitə seçməkdir. Və bu vasitələrlə Allaha yaxınlaşırlar.

**“Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!” (deyirlər).**

*(Zumər, 3)*

---

Muharriflərdə vəsilə - özünlə Allah arasında sənin barəndə Ona xəbər verən, sənin istəklərini Ona çatdıran vasitə kimi qələmə verirlər. Sanki Allahın səndən xəbəri yoxdur. Yaxud, sanki Allah xəsisdir – bu vasitələrlə yaxınlaşmasan, istədiyini verməz.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَابْتَغُوا إِلَيْهِ الْوَسِيلَةَ وَجَاهِدُوا فِي سَبِيلِهِ لَعَلَّكُمْ تُفْلِحُونَ

**Ey iman gətirənlər! Allahdan qorxun, Ona vəsilə yol axtarın. Allah yolunda cihad edin ki, nicat tapasınız!**

*(Maidə, 35)*

---

Deyirlər: Allah Ona vəsilə götürməyi əmr edir. Onlarda vəsilə - vasitədir. Beləcə, onlar sözün yerini dəyişərək mənanı təhrif edirlər. Şəriətdə, Quranda və Sünnədə vəsilə - Allaha yaxınlaşdıran taət, Allaha ad və sifətləri ilə təvəssüldür. Bu, şəriət vəsiləsidir.

Yaradılmışlar (məxluqlar) vasitəsilə təvəssül – qadağan olunmuş vəsilədir, ilk müşriklərin etdikləri və günümüzdəkilərin də etməkdə davam etdikləri şirki vəsilədir. Şirki vəsilə adlandırırlar, lakin Allah heç bir zaman şirki onun üçün vəsilə etməyib.

**Allah Quranda belə deyib**

---

أفرأيتم اللات والعزى ومناة الثالثة الأخرىٰ

**Bir deyin görək Lat və Uzza ni gördünüz?!**

**Digər üçüncü olan Mənat da həmçinin?!**

*(ən-Nəcm, 19-20)*

---

Bu, daş və ağaclara sitayiş edənlərin müşrik olmalarına dair sübutdur. "Görmədinizmi" – bu, qınama (istifhəm) sualıdır, yəni mənə xəbər verin.

**Lat** – Məkkə yolunda yaşayan saleh bir şəxs olub, hacılar üçün yemək bişirib onları yedizdirərmiş. Ölümündən sonra qəbiri üzərində kiçik ev tikib pərdələr asdılar və Allahla yanaşı ona sitayiş etməyə başladılar.

**Uzza** – Məkkə və Taif arasındakı palma vadisində ağacdır. Ətrafında tikililər tikdilər, pərdə çəkdilər və burada xidmətçi vardı. Orda şeytanlar insanlarla danışırdılar. Cahil insanlar elə fikirləşirdilər ki, ağac və ya tikili özü onlarla danışır. O vaxt şeytanlar onlarla danışıb Allahın doğru yolundan azdırırdılar. Bu büt Qureyşdə idi, Məkkə və onun yaxınlığındakı əhali üçün idi.

**Mənat** – Məkkə və Mədinə arasında yerləşən Hədid dağı yaxınlığında böyük qaya idi. Xəzrəc, Us və Huz əhalisi üçün idi. Həccə gedərkən burada ihram geyinir və Allahla yanaşı, ona sitayiş edirdilər.

Bunlar o zamankı ərəblərin üç ən böyük vasanları idi.

Vasan sözü (الوثن) yalnız daşlar və ağaclar deyil, vasan – şəriətdə Allahdan başqasına nəyə ibadət edilirsə o – vasandır.

**Bir deyin görək Lat və Uzza ni gördünüz?!**

---

Uca Allah soruşur: məgər onlar sizə fayda verdimi və ya nədəsə kömək etdilərmi? Məgər onlar yaradır, ruzi verir, hayat alıb verir? Siz onlarda nə tapmısınız? Belə məzəmmət və müraciətlə Allah bu ayədə ağıl sahiblərinə müraciət edir.

İslam gəldikdən və peyğəmbər (صلى الله عليه و سلم) Məkkəni fəth etdikdən sonra Müğirə ibn Şubəni və Əbu Sufyan ibn Hərbi (رضي الله عنه) Latı dağıtmaları üçün Taifə göndərdi. Xalid ibn Validi Uzzaya göndərdi ki, onu dağıtsın, ağacı doğrasın və camaatı azdıran cinayətkarı öldürsün. Və Əli ibn Abu Talibi (رضي الله عنه) Mənata göndərdi ki, onu dağıtsın.

**Onlar heç özlərini qoruya bilmədilər, onlara sitayiş edənləri neçə qoruya bilərlər?**

*(Nəcm-19-20)*

---

Onlar hara yoxa çıxdılar? Sizə fayda verdilərmi? Onlar özlərini Allahın əsgərlərindən muvahhidlərdən qoruya bildilərmi?

Bu üç islamdan əvvəl ərəblərin tanrıları sübut edir ki, kimi ağaclara, kimi daşlara, kimiləri isə qəbirdəki salehlərə ibadət edirmişlər.

**Əbu Vəqd Leysidən rəvayət olunur ki, o, peyğəmbərlə (Allahın ona salavatı və salamı olsun) birlikdə Huneynə çıxır. Bu, küfrə yaxın vaxtlar idi və müşriklər ağacın ətrafında toplanıb öz silahlarını ona asırdılar. Onlar bu ağaca çatanda dedilər: bizə də belə birini düzəlt ki, silahlarımızı asa bilək.** *(ət-Tirmizi rəvayət edib, 2180)*

Müşriklər öz silahlarını ağaca xeyir-dua almaq üçün asırdılar, ağacdan bərəkət diləmək məqsədilə. İslama yeni gələn və tövhidin tam olaraq bilməyən səhabələr dedilər: "bizə

də beləsini düzəlt...” bu təqlid isə daha böyük bədbəxtçilikdir. Peyğəmbər ( صلى الله عليه و سلم) belə cavab verdi:

**“Allahu Akbar – bu onların yoludur. Qəlbim əlində Olana and olsun ki, siz indi mənə İsrail oğullarının Musaya dediklərini dediniz: Ey Musa! Bizə onlarda olan kimi bir tanrı düzəlt”. O dedi: “Həqiqətən də, siz cahil insanlarsınız” (Əraf, 138). Sizdən əvvəlkilərin yolu ilə getməyin”.**

Peyğəmbər (صلى الله عليه و سلم) öz səhabələrinə bunu qadağan etdi və onlar bunu başa düşüb tərk etdilər, Allaha şərik qoşmadılar və buna son qoydular. Onlar bunu Allahın elçisindən (صلى الله عليه و سلم) bilərəkdən deyil, elmsizlikdən istədilər, başa düşəndə ki, bu şirkdir, tərk etdilər. Peyğəmbərin (Allahın ona salavatı və salamı olsun) əmr etdiyinə əməl etdilər.

**Bu üç məsələ göstərir ki:**

1. Tövhidi bilməməyin ciddi məsələ olması; kim tövhidi bilmirsə, elmsizlikdən şirkə düşə bilər, burdan görünür ki, tövhidi öyrənmək vacibdir. Onun əksi isə şirk əməldir, insan bilməlidir ki, elmsizlikdən nəyə düşə bilər, xüsusilə də, görəndə ki, kimsə bunu edir və düşünür ki, haqq yoldadır, yenə də elmsizliyindən. Bu elə cahilliyin zərəlidir, xüsusilə də əqidədə.
2. Bu hədisdə müşriklərə bənzəmənin ciddi məsələ olması vurğulanıb, çünki bənzəmək özü də şirkə aparır, necə ki, peyğəmbərimiz (Allahın ona salavatı və salamı olsun) buyurur: **“Kim özünü bir ğövmə oxşadarsa, onlardandır”. (Əbu Davud, 4031).** Özünü müşriklərə bənzətmək olmaz.
3. Daşlardan, ağaclardan, qəbir daşlarından, məzarlardan xeyir-dua istəmək, onlara nə ad verirlərsə-versinlər – şirkdir.

Onlar islam dinin əsaslar əsasını tərk ediblər, bu o əsasdır ki, bunsuz din yoxdur. Və bu o əsasdır ki, ona Rəsul Allah (صلى الله عليه و سلم) dəvət edib – tövhid. Zamanımızın şirk əhli rafizilər və sufilər bir zərrə qədər olsada islama yaxınlaşmayıblar  və heçnə dərk etməyiblər peyğəmbərin (صلى الله عليه و سلم) dinindən və dəvətindən.

# Dördüncü qayda.

**Həqiqətən də, günümüzün müşrikləri ilk müşriklərə nisbətən daha kobud şəkildə şirk edirlər. Çünki ilk müşriklər Allaha yalnız rifah anlarında şərik qoşurdular, çətin anlarda isə Tək Allaha ixlasla, səmimi qəlbdən ibadət edirdilər. Lakin günümüzdəki müşriklərin şirki daimidir – rifah anlarında, salamatlıq və bədbəxtlik anlarda, çətin vəziyyətlərdə. Buna dəlil Allahın sözləridir:**

---

فَإِذَا رَكِبُوا فِي الْفُلْكِ دَعَوُا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ فَلَمَّا نَجَّاهُمْ إِلَى الْبَرِّ إِذَا هُمْ يُشْرِكُونَ

**Müşriklər gəmiyə mindikləri zaman dini  yalnız Ona məxsus edərək ixlasla Allaha dua edərlər. Allah onları sağ-salamat quruya çıxaran kimi, yenə də Ona şərik qoşarlar.** *(Ənkəbut, 65)*

---

Şeyx ibn Bəz (رحمه الله تعالى) bu qaydanın şərhində bəyən edir ki, zamanımızın müşrikləri şirklərində birincilərdən kobud və şiddətlidir. Belə ki birincilər Allaha ibadətdə yalnız rifah anlarında şərik qoşurdular, lakin çətin anlarda Allaha ixlasla ibadət edirdilər. Zamanımızda bu şirk bir çox dövlətlərdə mövcüddur, onlar Hüseyn ibn Əli ibn Abu Talib (رضي الله عنه), Abdur Qadir Ciləni və başqalarına ibadət edənlərdir.
Və bu dövlətlərdə islama dəvət edənlərin üzərində ən vacib olan əməl müsəlmanları şirkdən və onun əhlindən çekindirməkdir.

Allah Quranda deyir:

**Müşriklər gəmiyə mindikləri zaman dini  yalnız Ona məxsus edərək ixlasla Allaha dua edərlər.**

Yəni dənizdə gəmiyə mindikləri zaman onlar qorxurdular ki bata bilərlər, ona görədə Allaha ixlasla dua edirdilər, ibadəti Tək Allaha sərf edərdilər. Quruya çatdığda isə, Allah onları dənizin şiddətindən xilas etdikdən sonra, qayıdırdılar öz şirklərinə.

وَإِذَا مَسَّكُمُ الضُّرُّ فِي الْبَحْرِ ضَلَّ مَن تَدْعُونَ إِلَّا إِيَّاهُ فَلَمَّا نَجَّاكُمْ إِلَى الْبَرِّ أَعْرَضْتُمْ وَكَانَ الإِنسَانُ كَفُورًا

**Sizə dənizdə bir çətinlik  üz verdiyi zaman Allahdan bağqasına ibadət etdiyiniz qeyb olar. Lakin O sizi xilas edib quruya çıxartdıqda üz döndərirsiniz. İnsan nankordur!**

*(İsra, 67)*

---

Və bu ayədə

وَإِذَا غَشِيَهُم مَّوْجٌ كَالظُّلَلِ دَعَوُا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ

**Onların ətrafına kölgə salan uca dağlar kimi dalğalar bürüdüyü zaman onlar dini Allaha məxsus edərək yalnız Ona dua edərlər**

*(Loqman, 32)*

---

Bu əvvəlki müşriklərin halıdır. Onların şirki rifah anlarında edirdilər. Lakin şiddətli və çətin anlarda, kədərli və fəlakət zamanlarda öz batil tanrıları unudurdular və Allaha ixlasla ibadət edirdilər.

Şeyx ibn Bəz (رحمه الله تعالى) qeyd edir ki: bu müşriklərin Allaha qarşı olan münasibətidir, onların əksəriyətinin halıdır. Onlar şiddətli və kədərli anlarda Allaha ixlasla ibadət edirlər. Bilirlər ki, Allahdan başqa onları heç kes xilas edə bilməz. Və bilirlər ki Allahdan başqa ibadətə laiq olan haqq məbud yoxdur. Bunu bunlar bilirlər, ona görədə duaları, istəkləri, bir ibadəti Tək Allaha yönəldirlər. Və Allahı təkləyirlər. Ona tövhidlə

ibadət edirlər. Bunlar hamısı şiddətli anlarda baş verir. Lakin bu onlara xeyir verməyəcək, necə ki Firona xeyr vermədi. O dənizə batan zaman belə dedi:

قَالَ آمَنتُ أَنَّهُ لَا إِلَٰهَ إِلَّا الَّذِي آمَنَتْ بِهِ بَنُو إِسْرَائِيلَ وَأَنَا مِنَ الْمُسْلِمِينَ
آلْآنَ وَقَدْ عَصَيْتَ قَبْلُ وَكُنتَ مِنَ الْمُفْسِدِينَ

**Firon batacağı anda: "İsrail oğullarının inandıqlarılarından başqa tanrı olmadığına iman gətirdim. Mən artıq müsəlmanlradanam!" – dedi. İndimi? Halbuki əvvəlcə Allaha qarşı çıxmış və fitnə-fəsad törədənlərdən olmuşdun!**

*(Yunus, 90)*

---

Yəni dənizə batacağı halda iman xeyr vermir, ölüm anı yaxınlaşan zaman iman xeyr vermir.

Zamanımızın şirk əhlinindən olanların, sufilərin, rafizilərin şirki daimidir. Həmçinin şeyxül-islam (رحمه الله تعالى) öz "Kəşf şühubət" adlı kitabında qeyd edir ki, ilk müşriklər saleh kimsələrə, mələklərə, peyğəmbər və övliyalara ibadət edirdilər, günümüzdəki müşriklər isə şərəfsiz və gühankar kimsələrə pərəstiş edirlər və özləri də etiraf edirlər, onlar – namaz qılmayan, oruc tutmayan, zinadan və başqa iyrənc hərəkətlərdən imtina etməyən kəsləri önəmli şəxs və himayədar adlandırırlar, belə ki, onlar üçün heç bir öhdəlik yoxdur, onların fikrincə, onlar üçün haram və halal yoxdur. Bu yalnız axmaqlar üçündür. Bəzi ölklələrdə Hindistan bölqələrində hətta inəyədə ibadət edənlər var, itə və eşşeyə. Bununla yanaşı müşriklərin halı deyişmir, inəyə, bütlərə, salehlərə, övliyalara, daşlara, ağaclara ibadət edənlərin halı birdir. Onlar hamısı Allahdan başqasına ibadət edirlər, və bu o şirkdir ki Allah onu bağışlamır, və sahibini tövbə edib, Allaha ixlasla ibadət etməsə dünyasını deyişənə gədər, Cəhənnəmə əbədi olaraq daxil edir və əzablara əbədi olaraq düçar edir.

Və Əhli Sünnə iddia edənlərin vəzifəsi, sələfiliyə dəvət edənlərin ən birinci və əhəmiyətli vacib olan dəvətləri, Allah qarşısında məsuliyyətləri muasir hizbiya

camaatlarından fərqli olaraq ondan ibarətdir ki insanlara hansı dövlətdə olursa olsun tövhid və şirk məsələlırini bəyən etməkdir. Lakin təsuflar olsun onların bəziləri qarşılarında dəvət olunanların gecə və gündüz, açıq-aydın şirkə məruz qalmalarını görmürlər. Və deyirlər ki, biz dəvətimizdə insanlara qarşı mərhəmətli, hikmətli olmalıyıq ki, onlar bizdən üz döndərməsinlər. Bəziləri isə dəvətlərinin birinci mərhələsində, o zaman ki dəvətləri və dərlsləri az saida insanlar əhatə edirdi, tövhid məsələlərini izzah edir və şirkdən çekindirirdilər. Lakin onların dəvətlərinin dairəsi geniş formatlı olduğundan sonra, yəni kütləvi informasiya vasitəsilə din barədə məqalələr çap etmək, radio və televiziya vasitəsilə dərslər seslǝndirmək, kitablar çap etmək və onları satış məntəqələrində yayımlamaq fürsətinə nail olduğdan sonra, dininin əsasını unudurlar. Və tövhid və şirkdən danışmırlar. Hətta mescidlərdə minbərlərdən bu əsasa dəvət unudulub. Və bu əlbəttə ki peyğəmbər (صلى الله عليه و سلم) mənhəcinə muxalifdir, Əhli Sünnə dəvətçisi şirk haqda heç bir zaman susmamalıdır. Əgər dəvətçi dinin bu əsasını tərk ədərsə o gecə gündüz dəfələrlə tekrar etsə belə ki, o Əhli Sünnə dəvətçisidir, o Əhli Sünnədən olmur. O səbəbdən ki o sünnənin əsasını tərk edib – və bu tövhiddir. Şirkdən danşımayan, onu haqqda susan, şirk əhlilə yaxşı münasibətlər bəsələməyə dəvət edən, onlarla yaxınlaşmağa, onlara kömək etməyə dəvət edən, heçnə anlamayıb rəsul Allahın (صلى الله عليه و سلم) getdiyi yolundan və etdiyi dəvətindən.

أستغفرالله لي و لكم, الحمد الله رب العالمين و صلى لله و سلّم على نبينا محمد و آله و صحبه أجمين

**1429 –cu il, Zülqaidə 3.**